# RECEIVERS IN HISTORY AND THEIR PLACE AND ROLE IN THE HISTORY OF THE CAUCASUS

**Qasim Hajiyev**[1]

UOT 719.
KBT 63.48(=60)

**Keywords:**

Caucasus
Azerbaijan
Turks
Alans
History
Archeology

**ABSTRACT**

In the Caucasus, on the northern borders of Azerbaijan, in the area up to the north of the Caspian Sea, ancient ethnoses, tribes, peoples once lived, existed at different times and in different periods, and created states. These states have established mutual relations with neighboring countries and peoples, leaving a historical and cultural heritage. One of these ethnoses and tribes is the ones who created the state and empire at the beginning of the era. Interesting information about the recipients is kept in written sources. At the same time, a large number of research works have been dedicated to the recipients and the recipient state. These studies reflect the origins of the recipients, their distribution area, and their interactions with neighboring peoples and states. Opinions and opinions have been put forward on the issue of the origin and affiliation of the recipients, in other words, on the issues of predecessorship and succession, which have led to extensive discussions, but this problem has not yet been fully resolved. Given the great diversity of views on this issue, we consider it preferable to take a concrete approach to the solution of this problem, to express laconic views. The article looks at written source data, research on this problem, groups similar and different information, generalizes, expresses historical-scientific attitude, draws conclusions and puts forward new ideas. Specifically, we envisage that it will be a step towards eliminating the mistakes, gaps and black-and-white spots made as a result of non-objective approaches to issues related to Turks and Turkism during the Soviet era.

[1]. Head of the Department of Armenian Studies of the Institute of Caucasus Studies of ANAS
gasimh@mail.ru
*Received: 27.04.2021*
*Accepted: 07.06.2021*

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)



# TARİXDƏ ALANLAR VƏ ONLARIN QAFQAZ TARİXİNDƏ YERİ VƏ ROLU

**Qasım Hacıyev**[1]

UOT 719.
KBT 63.48(=60)

**Açar sözlər:**

Qafqaz
Azərbaycan
Türklər
Alanlar
Tarix
Arxeologiya

**ANNOTASİYA**

Qafqazda, Azərbaycanın şimal sərhədlərində, Xəzər dənizinin şimalına qədər ərazidə vaxtilə qədim etnoslar, tayfalar, xalqlar yerləşmiş, fərqli dövrlərdə və müxtəlif müddətlərdə mövcud olmuş, dövlətlər yaratmışlar. Bu xalqlar və dövlətlər özlərindən sonraya tarixi, mədəni irs qoymuşlar. Bunlardan biri eranın əvvəllərində dövlət və imperiya qurmuş, qonşu dövlətlər və xalqlarla qarşılıqılı münasibətlər yaratmış alanlardır. Alanlara dair yazılı mənbələrdə maraqlı məlumatlar saxlanmışdır. Eyni zamanda alanlara, alan dövlətinə çoxlu sayda tədqiqat işləri həsr edilmişdir. Bu tədqiqatlarda alanların meydana çıxması, yayılma arealı, qonşu xalqlar və dövlətlərlə qarşılıqlı əlaqələrinə dair fikirlər öz əksini tapmışdır. Geniş müzakirələrə səbəb olan alanların mənşəyi və mənsubiyyəti məsələsi, başqa sözlə sələflik və xələflik məsələlərinə dair də fikirlər, mülahizələr irəli sürülmüş, lakin bu problem hələ də tam həllini tapmamışdır. Məqalədə yazılı mənbə məlumatlarına, bu problemlə bağlı tədqiqatlara nəzər salınır, oxşar və fərqli məlumatlar qruplaşdırılır, ümumiləşdirmə aparılır, tarixi-elmi münasibət bildirilir, nəticə çıxarılaraq yeni fikirlər irəli sürülür. Konkret olaraq sovetlər dövründə türklə və türkçülüklə bağlı məsələlərdə qeyri obyektiv yanaşmalar nəticəsində edilmiş səhvlərin, boşluqların, ağ-qara ləkələrin aradan qaldırılması istiqamətində atılan bir addım olacağını nəzərdə tuturuq.

---

[1]. AMEA Qafqazşünaslıq İnstitutu Ermənişünaslıq şöbəsinin müdiri
gasimh@mail.ru
*Məqalə redaksiyaya daxil olmuşdur: 27.04.2021*
*Təkrar işlənməyə göndərilmişdir: 28.05.2021*
*Çapa qəbul edilmişdir: 07.06.2021*

## GİRİŞ

Alanlara dair kifayət qədər yazılı mənbə məlumatları və arxeoloji materiallar toplanmışdır. Tədqiqatla alanların meydana çıxdığı, yayıldığı ərazilərə dair, həmçinin onların kimliyi və yaratdığı dövlət quruluşları, tarixdə yeri və rolunu müyyənləşdirmək üçün kifayət qədər tədqiqatlar məlumdur. Belə ki, alanların tarix meydanına çıxdığı dövrü və onların mənsubiyyətini, xarakterik xüsusiyyətlərini öyrənmək üçün çoxsaylı tədqiqatlar aparılmışdır. Tədqiqat əsərlərində alanları bir etnos, tayfa birliyi, xalq və s. kimi təqdim edilmiş, onların tarixi bir çox aspektlərdən təhlil olunmuşdur. Alan dövləti, onun hərbi yürüşləri, sosial məişəti, mədəniyyətinə dair hərtərəfli və mürəkkəb fikirlər bildirmişdir. Bu məsələlər alanların mənşəyinin ilk baxışdan qeyri müəyyənliyi tədqiqatçıların daha çox diqqətini cəlb etmiş, bu səbəbindən tədqiqatçıların çoxu sözü gedən məsələyə toxunmuşdur.

Qeyd etmək lazımdır ki, eranın əvvəllərində Qafqazda gəlib yerləşdiyi və dövlət qurduqları bildirilən alanlara dair yazılı mənbə məlumatları, xüsusilə də həmdövr müəlliflərin məlumatları daha mötəbər material olaraq öz qiymətini saxlayır. Eyni zamanda alanların yaşayış yerlərində aparılmış çoxsaylı arxeoloji tədqiqatlar, aşkar edilmiş maddi mədəniyyət nümunələri təhlil edilmiş, ümumiləşdirmələr aparılmışdır. Eyni zamanda alanların keçmişinə, adının etimalogiyasına, qəbr abidə tiplərinə aid elmi-tədqiqat nəticələrinə dair fikirlər irəli sürülmüşdür. Yazılı mənbələrin müxtəlif dillərdə olan tərcümələrinə, müxtəlif aspektləri əks etdirən tədqiqat əsərlərinə müraciət etməklə, arxeoloji materialların tədqiqi ilə çıxarılan nəticələri obyektiv təhlil və şərh edilməklə böyük bir baza yaradılmışdır. Bütün bunlardan istifadə etməklə tarixdə alanların yerini və rolunu bu mövzuda fikir müxtəlifliyinin çox olmasını nəzərə alaraq bu problemin həllinə konkret yanaşmaya, lakonik fikirlər söyləməyə üstünlük verməyi düşünürük.

## Alanlar yazılı mənbələrdə

Yazılı mənbələrdə və tarixi, arxeoloji, etnoqrafik tədqiqatlarla alanların tarix səhnəsinə çıxması və tarixi soğrafiyası barədə çoxsaylıı maraqlı məlumatlar verilmişdir. Yazılı mənbələr sırasında antik dövr müəlliflərinin əsərləri mühüm yer tutur.

Strabon alanların qədim məskənlərinə, sosial strukturuna dair belə bir fikir bildirmişdir: "Bu ölkədə 4 kateqoriyaya aid insanlar yaşayır... Birinci kateqoriya ən başlıcasıdır –onlar buradan yaşına və nəslinə görə böyük olanlardan çar seçirlər; şəxsi keyfiyyətinə görə bu ali hakim və sərkərdədir. İkinci kateqoriya kahinlər (rahiblər) idi. Onlar qonşularla mübahisəli məsələləri (mülki iddia, məhkəmə) həll edirdilər. Üçüncü kateqoriya döyüşçülərdən və əkinçilərdən ibarət idi. Nəhayət, dördüncü – sadə xalq idi. Onlar hər işi görən və həyati vəsaitləri toplayan çar adamları idilər" [63, XI, 2, 3]. Eləcə də Strabon alanlarda silki bölgüdəki vəziyyətinə görə təbəqələrə bölünməsinə dair məlumat verərək onların sırasında ikinci yerdə olanların titullarını göstərməsə də bu şəxslərin orduya başçılıq etmələri və məhkəmə işlərini idarə etmələri barədə məlumat vermişdir [63, XI, 5, 3]. Strabon alanlara dair belə bir məlumat da vermişdir ki, «bir çar bütün tayfaları idarə edir, onda əvvəllər olduğu kimi, müxtəlifdilli hər tayfa öz çarı tərəfindən idarə olunur… Onlarda baş kahinin vəzifələrini çardan sonra ən hörmətli adamlar yerinə yetirirlər; o, böyük və sıx əhalili vilayətlərin başında durur, eləcə də məbəd adamlarına başçılıq edir» [63, XII, 4, 5].

Tədqiqatçıların gəldiyi nəticəyə görə Roma tarixçisi Dion Kassi Kokkeian alanların Cənubi Qafqaza doğru hərəkət istiqamətini müəyyənləşdirmişdir. Dion Kassinin əsərinin bərpa olunmuş ümumi toplusuna istinad edərək S.M.Perevalov belə bir fikir irəli sürmüşdür ki, "Farsman tərəfindən albanların (torpaqlarında) … (müharibə) Midiyanı (Atropatena- Q.H.) möhkəm sarsıtdı, Kappadokiyaya da toxundu və ona görə qurtardı ki, albanlar bir tərəfdən Voloqezin

hədiyyələri ilə ələ alındılar, digər tərəfdən isə Kappadokiya hökumdarı Flavi Arriandan qorxurdular" [54]. Dion Kassinin alan ordusunun hərəkət istiqamətinə dair fikirlər həqiqətə uyğundur, lakin Albaniya ərazisindən keçərkən münasibətlərin mahiyyətinə dair heç bir məlumat verməməsi təəccüb doğurur [5, 179-181]. Məlumatlar tədqiq edilərkən buraxılmış yanılışlıqlar da istisna deyil.

F.de Monpere alanların eramızın 135-ci ilində Cənubi Qafqaza yürüşlərini nəzərdə tutaraq bildirir: «Arrianın (Flavi) mətninə görə, osetinlər Gürcüstanla yalnız ittifaq bağlamamış, həm də bu çarlığı özlərinə tabe etmişdilər». Lakin Y.Q.Qaqloyti isə Arrian Flavinin, Dion Kassinin və digər antik müəlliflərin mətnlərini təhlil edərək de Monperenin ideyalarının şübhəli olmasını bildirir [21, 179-181]. Ümumilikdə, Farasman və Xsefarnuqun etnik mənsubiyyətləri, eləcə də onların Kartlidə hakimiyyətə gəlmə şərtləri və şəraiti barədə məsələlər mübahisəli olaraq qalır [25].

Antik mənbələrlə olduğu kimi orta əsr mənbələrində də alanlara dair məlumatlar verilmişdir. M.Kalankatuklunun "Albaniya tarixi"də Albaniyanın tarixi-coğrafi şəraitinə, iqtisadi və mədəni tarixinə dair məlumatlarla bərabər Şimali Qafqaz xalqları haqqında da maraqlı faktlar yer almışdır [32, к.1, f.21]. Bu mənbələrin birində bildirilir ki, Sasani şahı Firuz Alan qapıları yaxınlığında haylandur tayfaları ilə danışıqlar apararaq onları müharibəyə cəlb etdi və onların köməyi ilə uzun müddət Albaniyanı gərgin vəziyyətdə saxladı. Bununla bərabər "Albaniya tarixi"də alanların iki dəfə Albaniya ərazilərinə hücum edərək şəhər və kəndləri qarət etməsi və saysız-hesabsız əsir aparması barədə də məlumat verilir [32, к.1, f.21]. Burada yalnız alanların hərbi gücü, etdiyi hücumlar barədə məlumat əldə etmiş oluruq.

Maraqlı məsələlərdən biri alanların mənşəyinin, yayılma arealı, yaratdıqları dövlətin, onların məişəti, iqtisadi və sosial həyatının müəyyənləşdirilməsidir. Məlumdur ki, eranın əvvəllərinədək "alan" etnoniminə rast gəlinmir. Bizim eranın əvvəllərində isə Roma müəllifləri Lukan, Seneka, Valeri Flakk, Plini Sekund və İosif Flavi əsərlərində alan tayfalarının adını çəkmişlər. Lakin alanların sarmatlarla bağlılığını nəzərə alaraq bu problemin tədqiqinə sarmatların tarix səhnəsinə çıxması dövründən başlamaq məqsədəuyğun hesab edilmişdir [69, 181-188]. Bu zaman onların mənşə məsələsinə dair fikir formalaşır: skif-sarmat-alan şəcərəsi müəyyənləşir.

Alanlara dair şərq ölkələrinin tarixçi, səyyah və coğrafiyaşünasları da maraqlı məlumatlar vermişlər. Ərəb müəllifi (X əsr) Məsudi Alaniyanın siyasi və hərbi qüdrətini xarakterizə edərək bildirir ki, alan çarı "qüdrətlidir, cəsurdur, çox güclüdür və çarlar arasında siyasət aparır" və "yürüşə 30 min atlı ilə gedir" [3, 29-78].

Maraqlı məsələlərdən biri də İbn Rüştanın məlumatıdır: "Kür çayı alanlar ölkəsindən axır, Tiflis və Bərdənin yanından keçir, Təbəristan dənizinə tökülür" [45, 35]. Burada müəllifin qeyd etdiyi əlamət və xüsusiyyətlərin Albaniya ölkəsinə uyğun olduğu görünür, başqa sözlə bu mənbədə Alaniya ilə Albaniya eyniləşdirilir. Bu məlumatları müəlliflərinin yaşadıqları dövrlə əlaqəli təhlil etməklə alan dövlətinin artıq süquta uğradığı dövrə düşdüyünü görürük. Bu məsələnin bir tərəfidir. Digər tərəfi isə alanlarla albanların tarixdə yaxınlığa dair digərlərindən fərqli fikirlərin bildirilməsidir.

Beləliklə, mənbələrdə verilən məlumatların çoxunun üst-üstə düşməməsi də yanlışlıqlar yaratdığı diqqəti cəlb edir. Bir sıra müəlliflərin, öz dövründən əvvəlki tarixi hadisələrə münasibət və etnik məsələlərlə bağlı yanlış fikir bildirməsi dolaşıqlıqlara səbəb olmuşdur. Bu baxımdan həmin məlumatları tədqiq edərkən tənqidi təhlillər aparılmalı, bu məsələlər aydınlaşdırılmalı, mahiyyəti obyektiv şəkildə şərh edilməlidir.

## Alanlar elmi-tarixi tədqiqatlarda

Alanların tarixinə, onların tarixinin ayrı-ayrı aspektlərinə dair xeyli tədqiqatlar həsr edilmişdir. Burada albanlara dair vaxtilə aparılmış tədqiqatları, öyrənilmə səviyyəsini, elmi-tarixi əhəmiyyətini, onların xarakterik

cəhətlərini, obyektiv, yaxud subyektivliyini müəyyənləşdirməklə yeni baxış bucağı altında baxmağın vacibliyini bildirmək istərdik.

B.F.Minorski və A.E.Krımski kimi məşhur şərqşünaslar Alaniyaya, onların yerləşdiyi ərazilərə, mövcud olduqları dövrə dair qısa məlumatlar vermişlər. Bunlarla yanaşı alanların tarixinə dair geniş və mötəbər məlumatları K.V.Trever vermişdir. K.V.Trever Qafqaz Albaniyasının tarixinə həsr etdiyi əsərində Albaniyaya şimaldan olan yürüşləri şərh edərkən alan məsələsinə də toxunmuşdur [64].

K.V.Trever qədim müəlliflərin əsərlərinə əsaslanaraq Qafqazda mövcud olan bu tayfaların bir hissəsinin Kür-Araz hövzəsində yerləşdiyini, onların saklar, alanlar və massagetlər olduğunu bildirmişdir. Müəllif arxeoloji cəhətdən tədqiq edilmiş katakomba qəbirləri mədəniyyəti daşıyıcılarına dair şərhlər verərək, həmin qəbir mədəniyyətinin nomadlara aid olduğunu bildirmişdir. Müəllif Albaniyada yerli coğrafi adların öyrənilməsinə dair tədqiqatında Albaniyanın əhalisinin Qafqaz, İran və türk mənşəli olması qənaətinə gəlmişdir [64]. Əgər Cənubi Qafqazda skif-sarmat (sak) - alanlar və massagetlər mövcud olmuşdursa (59) bu məsələni daha geniş mənada düşünmək onların türk mənşəli olmasını konkret şəkildə bildirmək olar.

Q.A.Melikişvilinin qeyd etdiyinə görə İberiya «çarları» tərəfindən onların daimi hərbi düşərgələrində iştirak etmək üçün xeyli sayda alanlar cəlb olunurdu [45, 355-356; 46].

Albaniya tarixinə dair uydurma fikirlərin müəlliflərinin alanlara dair saxta məlumatlar vermələri cəhdinə də təsadüfi baxılmamalıdır. Bu istiqamətdə tədqiqatlar imperiyaların müəyyənləşdirdiyi plana uyğun olaraq aparılmışdır. Məsələn XX əsrin 60-cı illərində çapdan çıxmış “Dağıstan tarixi”ndə Albaniyanın etnogenetik quruluşuna, tarixi coğrafiyasına dair bir sıra mülahizələr irəli sürülmüşdür [28]. Kitabda verilmiş xəritədə Qəbələ şəhəri Alazan və Sulaq çayları arasında göstərilmiş, mətndə isə indiki müasir Qəbələ ilə eyniləşdirilmişdir. Albaniya çarlığının mərkəzi Dağıstanda yerləşdirilmiş, Albaniyanın əhalisi isə dağıstanlıların sələfləri kimi verilmişdir. Son zamanlar belə fikirlərin irəli sürülməsi tarixin saxtalaşdırılmasına xidmət edir. Heç bir elmi əsası olmayan bu “tədqiqatlarda” Azərbaycana aid əraziləri ermənilərə, gürcülərə, ləzgilərə aid edirlər. Halbuki, Albaniya dövləti Azərbaycanın qədim dövlətlərindən biri, əhalisi isə əsasən azərbaycanlı alban-türk etnik qrupundan ibarətdir.

Rusiya Federasiyasında çap olunan, xüsusilə Dağıstan tədqiqatçılarının sırasında Albaniya tarixinə birtərəfli, qərəzli yanaşma hələ də davam etdirilir. Müasir xalqları millətlərin bir moxunun mənşəyinin qəsdən saxtalaşdırılması ənənəsi qoyulmuşdur ki, bu da başqalarının torpaqlarının işğalına xidmət edən siyasətlə bağlıdır. Bu məsələyə diqqət yetirməyimiz ümumi Qafqazın tarixinə dair yazılanları bilməklə tutduğumuz obyektiv mövqeyin üstünlüyünü də diqqətə çatdırmaqdır. Yeri gəlmişkən erməni tarixçilərinin yazdıqları daha qərəzli və uydurmadır.

Alanlarla bağlı bir sıra əsərlərin müəllifi S.M.Perevalov alanların Albaniya və Atropatenanı heç bir maneə olmadan qarət etməsi və Cənubi Qafqazdan tezliklə çıxıb getməsi barədə məlumat vermişdir. S.M.Perevalov bildirir ki, “Alanlar parfiyalı Vologezdən onun əyaləti Midiyanı (yəqin Atropatenanı – Q.H.) güclü şəkildə xaraba qoyduqları üçün xərac aldılar” [59]. Bütün bunlar alanlarla Cənubi Qafqazda mövcud olan dövlətlər və xalqlarla münasibətləri şərh etməyə imkan verir.

Maraqlı məsələlərdən biri də “alan” sözünün etimalogiyasıdır ki, bu məsələyə dair bir sıra tədqiqatçılar tərəfindən xüsusi diqqət yetirilmişdir. Tədqiqatlarda, II əsrdə - alan ittifaqı yaranan vaxdan Qafqazdan Ukrayna və Volqasahilinə qədər geniş bir məkanda oxşarlığı ilə vahid alan arxeoloji mədəniyyəti meydana çıxdığı bildirilir. Bu baxımdan diqqəti cəlb edən şərhlərdən biri

T.Kozırevanın alan termininin «döyüşdə yüksək ləyaqət» kimi başa düşülən «xsar» sözündən ibarət olduğunu bildirməsidir. Bu nöqteyi-nəzərdən Aşxadar və Aşxenin alan (hərbi) aristokratiyasının yüksək təbəqəsinə məxsusluğu ehtimal olunur [36, 224-225]. Aşxadar adının etimologiyasının araşdırılması nəticəsində sözün bir hissəsinin qədim İran dilində olan “xsathra” adı ilə uyğun gəldiyi bildirilir [25]. Qeyd etmək lazımdır ki, bir sıra antroponimlərin daşıyıcılarının yaşadıqları dövrü nəzərə alaraq onların ad anlayışlarında korrektə etməklə alanlara dair bir sıra ifadələrdə dəqiqləşdirmələr aparılmışdır. F.Qutnov isə terminin hərbi funksiya ilə bağlı olması və dövlətin yaranması dövrünə qədər “hərbi qüvvə”, “hərbi rəşadət” mənasını verdiyini bildirir [25]. V.İ.Abayev bu semantikanın osetin dilində üstünlük təşkil etdiyini bildirir [2, 236]. Müəllif bizim eranın ilk əsrlərində baş verənlərin təsvirində alan (ovs) “çarları” barədə məlumat verərkən gürcü tarixçisi Leonti Mroveliyə əsaslanaraq I Amazaspın hakimiyyəti dövründə ovs «çarı»nın yürüşü məsələsinə toxunur [1, 35-36] Bunlarla yanaşı F.Qutnov Armaz kitabələri aşkar olunana qədər pitiaxş institutunun «sırf farslara aid» edilməsini diqqətə çatdırır, lakin bunun Gürcüstanda IV-V əsrlərin hüdudlarında meydana çıxmasını əsas gətirərək [25, 234] Armaz kitabələrinin qədim Gürcüstanda pitiaxşların olmasını əyani şəkildə göstərdiyini bildirir [25, 52-54].

V.B.Kovalevskayanın «Qafqaz və alanlar» əsərində alanların Qafqaza gəlişi, onların yayıldığı ərazilər və s. məsələlər şərh edilmiş, həmçinin, alanların məskunlaşdığı ərazilər, onların etnik mənsubiyyəti, sosial, mədəni həyatı və adət-ənənələrinə dair məlumat vermişdir [35]. Onun «Qafqaz-skiflər, sarmatlar, alanlar b.e.ə. I sülsü-b.e.I əsrində» adlı əsərində Şimali Qafqazda məskunlaşmış qədim tayfaların antik dövr tarixi şərh edilmişdir [34]. Burada, qədim tayfaların, tayfa ittifaqlarının ümumi tarixi haqqında geniş məlumat verilmiş, yazılı mənbələr və arxeoloji materiallar əsasında alanların tarixi şərh edilmişdir.

V.A.Kuznetsovun «Alan tarixi oçerkləri», eləcə də onun “«Böyük İpək yolu» və Şimali Qafqaz” əsərlərində alanların ümumi tarixinə, indiki Şimali Qafqaz xalqlarının keçmişi ilə bağlılığına, digər xalqlarla əlaqələrinə dair dəyərli məlumatlar verilmişdir [41;42]. Bu səpkidə mənbə məlumatları əsasında A.Aleman «Alanlar qədim və orta əsr yazılı mənbələrdə» əsərində alan tayfalarının tarixinə, təsərrüfat həyatına, mədəni səviyyəsinə və hərbi qüdrətinə dair şərhlər vermişdir [7]. Bütün bunlar alanlar haqqında tarixi məlumatları zənginləşdirmək baxımından əhəmiyyətli olduğu kimi, qonşu dövlətlər və xalqlarla qarşılıqlı əlaqələrin öyrənilməsi baxımından da maraqlıdır.

Alanları osetinlərin sələfləri hesab edən Ö.S.Qaqloyti alanların mənşəyi məsələsinə toxunmuş və onların tarixinə dair məlumatlar vermişdir [20]. Ö.S.Qaqloyti “Alanlar və Osetiyanın etnogenezi məsələsi” adlı əsərində alanların nəsillərindən olan osetinlərin mənşəyi və tarixi keçmişinə dair şərh vermişdir [20]. K.F.Smirnov da Şimali Qafqaz ərazisində yaşamış sarmatların, savromatların, alanların tarixini tədqiqat obyekti kimi işıqlandırmışdır [58; 59; 60; 61; 62]. Son zamanlar isə alanlara dair daha bir maraqlı tədqiqat aparılmış, alanların mənşəyi, yayılma arealı və yaratdığı dövlətlərin tarixinə dair mənbə və tədqiqat materialları müəyyənləşdirilmiş, ümumiləşdirilmişdir. Alanların Qafqaz Albaniyası ilə qarşılıqlı münasibətlərinə dair maraqlı fikirlər bildirilmişdir [43].

Məlumdur ki, tarixdə elə həqiqətlər vardır ki, bunları inkar etmək olmaz. Məsələn, qotlar və onların siyasi birlikləri barədə qərb tarixşünaslığında bu baxımdan diqqət çəkən məlumatlar mövcuddur. Belə ki, yazılı mənbə məlumatlarının, həmçinin arxeoloji, lingivistik, [31] materialların müqayisə edilməsi ilə qotların Qara dənizin şimal sahilinə quru və dəniz yolu ilə yürüşlər etmələri və güclü siyasi birlik yaratması məlumdur. Qotların Qara dənizin şimal sahilinin böyük bir hissəsində hegemonluq etməsi, həmin dövrdə bu ərazilərin Romanın tabeçiliyində olması bildirilmişdir [51]. Bu zaman qotlar daha yüksək olan yerli sivilizasiyanın təsiri altına düşmüşlər. Hətta bu elə bir vəziyyət almışdır ki, onları

arxeoloji cəhətdən ayırmaq belə mümkün olmamışdır [20, 50-55]. İlk orta əsrlərdə Cənubi-Şərqi Avropanın bir hissəsinin qotlara tabe olduğuna baxmayaraq alanlar müstəqil olmuş, heç bir dövlətə tabe olmamışlar [18]. Artıq bu məsələ tarixiləşmiş və birmənalı şəkildə qəbul edilmişdir. Alanlara dair tədqiqatlardan da birmənalı nəticələr çıxarmaq mümkündür. Ancaq bu məsələlərə obyektiv yanaşılarsa daha mötəbər nəticələr çıxarılar.

Maraqlıdır ki, osetinlər balkarları aslar adlandırırlar və bu ad altında balkarların gəlməsinədək burada yaşayan xalqı nəzərdə tuturlar [6, 108-112].

V.A.Kuznetsov İ.M.Miziyevin tədqiqatlarına [48, 33] işarə edərək qeyd edir ki, son 15-20 ildə Balkariya və Qaraçayın bir çox tarixçi və filoloqlarının cəhdləri – alanların türkdilli olması, qaraçaylıların və balkarların rekonstruksiya olunmuş türk-alanlardan törəmələri və alan əhalisinin Yuxarı Kuban hövzəsində olmamaları barədə konsepsiya meydana çıxmışdır [41]. Bu fikri sübut etmək üçün qeyd edilir ki, XVII əsrdə Qafqaza səyahət edən türk səyyahı Övliya Çələbi abxazlar arasında fonetik baxımdan ubıxların eyni adlı tayfası ilə üst-üstə düşən “Arlan nəsli”nin adını çəkilir.

XX əsrin 80-90-cı illərindəki tədqiqatında İ.M.Miziyev Y.Klaprotun, V.F.Millerin, V.İ.Abayevin və b. alanların İran mənşəli olmasına dair tədqiqatlarını etibarsız, köhnəlmiş hesab edir. O, alanların İran mənşəli olmasına dair fikirlərin əleyhinə çıxır. O asların, yəni alanların türk xalqı olması barədə kifayət qədər yazılı mənbə məlumatları olduğunu vurğulamışdır. Onun bu mövzuya bir neçə monoqrafiya həsr etməsi də təsadüfi deyildir. Müəllif, əsərlərinin birində “os” sözünün türk etnonimi olan “as”-ın təhrif olunmuş, gürcü dilində bir forması olduğunu qeyd etmişdir.

M.İ.Miziyev “alan” və “as” etnonimlərdən qaraçaylıların və balkarların bu gün də istifadə edildiyi bildirilir. O, bu ifadəni Ey, alan! Ey, alanlar! kimi müraciət formalarında işləndiyini vurğulayır [48].

Qeyd etmək lazımdır ki, İ.M.Miziyevin konsepsiyası V.İ.Markovin, V.A.Kuznetsov, İ.M.Çeçenov, V.M.Batçayev, V.N.Kaminski və Y.S.Qaqloyti tərəfindən etirazla qarşılansa da o, öz fikrindən dönməmişdir.

Əslində alan sözü heç bir əlavə etmədən günümüzdə də çoxlu sayda ifadə formasında işlədilən söz olduğu məlumdur. Azərbaycan türkcəsində alan sözünün mənası almaq, nail olmaq, əldə etmək kimi qətiyyət bildirən ifadələr kimi işlədilir. Məsələn öc alan, qisas alan, intiqam alan və s. şəkildə isim və sifət kimi işləndiyi, əsasən nəyi isə almağa qadir olan mənasını verir.

Q.V.Tsulaya bir məqaləsində yazır: “Tarixi-arxeoloji tədqiqat alimləri çoxdan antik dövrdən erkən orta əsrlərədək, Dağıstandan bütün Meqreliyaya qədər ... demək olar ki, bütün Qafqaz xalqlarının tarixində alanların böyük rolu olması barədə fikir bildirmişdir” [68, 89]. O, Ş.D.İnal-İpan isə alan, as, sarmat qəbilələrini vaxtilə Abxaziyada məskunlaşan sarmat–alanları-osetin kimi əlaqələndirir və bu qrupların nəsilinin eyni olduğunu bildirir [26, 223]. Lakin, alanları genetik əlaqələrə görə yalnız osetinlərlə deyil, həm də balkarlarla, qaraçaylarla, adıqlarla, adıgeylərlə, ubuxlarla, abxazlarla birləşdirdiyini unutmaq olmaz.

İ.Miziyev yazır ki, “Köçəri skiflərin sələfləri kimi alanlar öz məişət və mədəniyyətində əcdadlarının - sarmatların bütün əsas elementlərini ənənəvi olaraq öz həyatı və dünyagörüşündə saxlamışdır” [47]. O, qədim müəlliflərin alanların müasirləri hesab etdiyi nomadlar (köçərilər) haqqında bildirir ki, onlar öz ailəsi və ev əşyaları ilə birlikdə köçürdülər. İ.Miziyev Ammian Marsellinə müraciət edərək onun köçəri sarmatlara dair: “heç bir daxması, taxıl becərmə fəaliyyəti yoxdur, onlar ət və südlə qidalanırlar, içərisi ağac qabığı ilə örtülmüş üstü örtülü arabada yaşayır və onlar ucsuz-bucaqsız çöllərdə yerlərini dəyişirlər” [6] məlumatını misal gətirərək onların sarmat-alanların təbiətinə daha çox uyğun gəldiyini bildirir. O, vurğulayır ki, həyatın tədricən

oturaq formasına keçidi, alanların mədəniyyətini və məişət tərzini kəskin dəyişdirmişdir. İ.Miziyevə görə "Onlar öz oturaq yaşayış yerində yeraltı qazmalar və xəndəklər düzəltmiş, sonra daş tikililərə keçərək, daş sokollar üzərində evlər tikməyə başlamış, daş qəbir tikililəri – sərdabələr, qəbirlər və s. inşa etmişlər" [52].

**Alanlar arxeoloji tədqiqatlarda**

Baron de Bayın XIX əsrin sonları XX əsrin əvvəllərində Azərbaycan ərazisində apardığı arxeoloji tədqiqat zamanı aşkar etdiyi maddi mədəniyyət nümunələrinə əsasən Alazan çayı yaxınlığında nəhəng ölçülü küplər və ov əşyalarının təsnifatını verərkən onların yerli və Şimali Qafqaza dair xüsusiyyətləri məsələsinə toxunmuşdur [37]. Rozendorf isə Gəncə-Xanlar yaxınlığında (Elenendorf) açdığı kurqanları həmin qəbirlərdən tapılmış maddi mədəniyyət nümunələrini təhlil edərək bu qəbirlərin sahiblərinin buraya sonradan gəlmə olduğunu bildirmişdir [65, 44]. Albaniyanın antik dövr arxeoloji abidələrinin ilk tədqiqatçılarından biri olan Rozendorfun, qəbir abidələri tipinə aid tədqiqatlar aparan E.A.Reslerin [55; 56] məlumatlarından qəbir abidələrinin müxtəlif xarakterli olsa da paralellik təşkil etdikləri anlaşılır.

Azərbaycan arxeoloqları A.A.Ələkbərovun, D.M.Şərifovun, A.A.İessenin və E.A.Paxomovun apardığı tədqiqatlarda vaxtilə indiki Gürcüstan və Şimali Qafqazın bir hissəsinin qədim Albaniya dövlətinin tərkibinə daxil olması qənaətinə gəlinmişdir ki, bu da Qafqazın şimalı ilə cənubu arasında münasibətlərin müxtəlif səpkidə mövcud olduğunu təsdiq edir.

K.Nioradze Qəbələdən aşkar edilmiş maddi mədəniyyət nümunələri əsasında bu mədəniyyətin yayıldığı əraziləri müəyyənləşdirməyə cəhd edərək Alazandan aşkar edilmiş e.ə. I əsrə aid maddi mədəniyyət nümunələrini (Alazan keramikasını) Cənubi Qafqaza Mil-Muğan düzləri vasitəsi ilə Ön Asiyadan keçdiyini bildirmişdir [53, 105]. Onu da qeyd etmək lazımdır ki, Ö.Ş.İsmizadə Albanıyanın əsas mərkəzini Alazan-Həftəran dərəsində yerləşdirmişdir [27, 160-175]. C.A.Xəlilov Qafqaz Albaniyasının maddi mədəniyyətini öyrənərkən katakomba qəbirləri və dəfn adətləri məsələlərinə xüsusi yer vermişdir [65, 44]. Müəllif bunu Ağdam yaxınlığında (1955-ci il) və Şamaxıda (1961-ci il) Yaloylutəpə mədəniyyətinə aid əşyalar olduğunu qeyd etmişdir [66].

A.A.Kudryavtsevin rəhbərliyi altında Dərbənd şəhərində Albaniyanın şimal hissəsi olan tarixən Çol adlandırılan ərazidə, indiki Dağıstan Respublikasının cənub-şərq bölgəsində aparılan arxeoloji tədqiqatlar yeni elmi nəticələrin əldə edilməsinə səbəb olmuşdur [38; 39; 40].

Alan irsinin əsas əlamətlərindən biri olan dəfin tipləri, xüsusilə də katakombalara həsr edilmiş tədqiqatlar da xeylidir [22, 151-160; 23, 77; 49, 62; 23, 169-170; 41, т. 2, 6, 7]. Bu baxımdan L.Q.Neçayevanın qəbir tiplərinə dair yazılarında Şimali Qafqazın katakomba qəbirlərini tədqiq edərkən bu qəbir tiplərinin etnik mənşəyinə dair irəli sürdüyü fikirlər də maraqlıdır [52, 267-292].

İ.H.Əliyevin «Sarmat-alanlar İran yolunda» məqaləsində katakomba qəbirləri mədəniyyəti daşıyıcılarının sarmat-massaget-alan mənşəli tayfalardan ibarət olduğunu bildirmişdir [8]. İqrar Əlievin və Qardaşxan Aslanovun sarmat-alan tayfalarının Azərbaycanda izlərinə həsr etdikləri məqalədə alanların yayılma ərazilərinə, həmçinin onların maddi mədəniyyət izlərinə, xüsusilə katakomba qəbirlərinə dair məlumatlarının tarixi elmi şərhi verilmişdir [9; 10, 218-237]. Q.M.Aslanov Mingəçevir katakombarının mühüm xüsusiyyətlərinin şərhini verərkən I-VII əsrlərə aid olan bu qəbirlərin alanlara aid olması fikrini irəli sürmüş və bunu sübut etmək üçün tədqiqat aparmışdır [10, 218-237].

İ.A.Babayev «Qafqaz Albaniyasının şəhərləri (b.e.ə.IV-b.e.III əsri)» adlı monoqrafiyasında Azərbaycan ərazisində antik dövrə dair aşkar edilmiş qəbir tiplərindən bəhs edərkən katakomba qəbilərinə xüsusi yer ayırmışdır. Müəllif Mingəçevirdən və Qəbələdən aşkar edilmiş katakombaların təsvirini, dövrünü, digər qəbir

tipləri ilə müqayisəsini və bu tip qəbirlərin yayıldığı əraziləri təhlil edilmişdir [14].

T.A.Qabuyevin «Şimali Osetiyanın b.e. IV əsrində alan qəbirləri» [18] və yenə də onun «Şimali Osetiyada Brut kəndi yaxınlığında alan kurqanları» [17] məqalələri alanların arxeoloji cəhətdən öyrənilməsinə həsr edilmiş, burada alanlara aid qəbir tiplərindən və aşkar edilmiş faktiki alan qəbirlərindən bəhs edilmişdir.

L.N.Qumilyovun Dərbənddə apardığı arxeoloji qazıntılarla aşkar etdiyi maddi mədəniyyət materiallarını (1961-ci il) tədqiq etmiş, bu tədqiqatlara "Xəzər kəşfləri" adlı əsər həsr etmişdir [24]. L.N.Qumilyov bu abidələrin fars mənşəli xalqlara aid olması ilə razılaşmır.

Arxeoloqlar Şimali Qafqazda Vladiqafqaz yaxınlığında Zilgi kəndində alanlara məxsus yaşayış məskənlərinə dair müdafiə tikililərindən birini - eramızın II-V əsrlərində fəaliyyət göstərmiş Zilgi şəhərinin xarabalığını aşkar etmişlər [11]. I.A.Arzantseva və Z.K.Albəyovanın «Kafər şəhərinin məişət daşları» eləcə də I.A.Arzantseva və V.Y.Malaşevin «Zilgin şəhər yeri və Şimali Qafqazın ilkin alan şəhərləri problemi» [12] əsərlərində alanların ümumi tarixi, təsərrüfat həyatı və şəhərsalma mədəniyyəti tədqiq edilmişdir.

V.B.Vinoqradov "B.e.ə.III-I əsrlərdə Ön Qafqazın sarmat qəbir abidələrinin interpretasiyasına dair" əsərində alanların Şimali Qafqazda meydana çıxması dövrünü dəqiqləşdirməyə cəhd göstərmişdir. Onun tədqiqatlarında Qafqazda, xüsusilə şimali-şərqi Qafqazda sarmatlara aid qəbir abidələrinin öyrənilməsinə xüsusi diqqət yetirilmişdir [15; 16].

V.N.Əliyev "Babadərvişdə katakomba" adlı məqaləsində Babadərvişdə aşkar etdiyi Katakombanın təsvirini vermiş, məlum olan bu tip qəbirlərlə müqayisələr aparmışdır [4; 32].

C.Ə.Xəlilov "Qafqaz Albaniyasının maddi mədəniyyəti" və yenə də onun "Xınıslı - qədim yaşayış yeri" əsərlərində Qafqaz Albaniyasına, sarmat-alanlara, xüsusi olaraq katakomba tipli qəbir abidələrinə dair maraqlı məlumatlar verilmişdir [65, 44]. Eləcə də C.Ə.Xəlilovun İ.A.Babayevlə birgə yazdıqları "Qafqaz Albaniyasının maddi mədəniyyətində antik ənənələr" adlı məqalədə albanların maddi mədəniyyət irsindən, Albaniya ərazisində mövcud olan qəbir tiplərindən, onun antik dövrdə məlum olan ənənələrindən bəhs edilmişdir [67].

Bunlarla yanaşı bir sıra tədqiqatçılar alanların məskun olduğu ərazilərdə aparılmış arxeoloji tədqiqatlar əsasında məqalələr yazmışlar. T.M.Minayeva «Yuxarı Kuban alanlarının tarixi arxeoloji məlumatlar əsasında», V.V.Sedovun «Çernyaxov mədəniyyəti dəfn adətlərində skif-sarmat elementləri» [49; 50], V.N.Kaminskinin «Orta Kubanda ilk orta əsr katakombaları» [29], T.A.Qabuyevin «Şimali Osetiyanın b.e. IV əsrində alan qəbirləri» və yenə də onun «Şimali Osetiyada Brut kəndi yaxınlığında alan kurqanları» [18; 19] məqalələri alanların tarixi arxeoloji tədqiqinə həsr edilmişdir Bu müəlliflər də alanları osetinlərin əcdadları kimi təqdim etmişlər.

Azərbaycan ərazisində aparılmış tədqiqatlar içərisində R.Qasımovanın "Mingəçevir arxeoloji qazıntılarından aşkar edilmiş kranioloji materiallara dair" məqaləsində ilk dəfə Mingəçevir katakomba qəbirlərindən aşkar edilmiş kəlləni antropoloji tədqiqi də maraqlıdır. O, həmin katakombaların mənşəyinə dair fikirlər bildirmişdir [30, 46-47]. D.İ.Kiriçenko həmin katakombalarından materiallarını antropoloji baxımdan tədqiq edərək "Antropoloji dəlillərə görə sarmat-alanlar Azərbaycanda" məqaləsində maraqlı şərh vermişdir [33].

**Nəticə**

Tədqiqat, antik və erkən orta əsrlərdə Qafqazın əhalisinin tərkibində Qafqaz mənşəli, türk mənşəli, İran mənşəli və d. komponentlərin mövcud olması məsələsi nəzərə alaraq onların tarixi izlərini təsdiq edən məlumatları, o cümlədən mötəbər faktları, dəyərli tədqiqat işlərini ümumiləşdirmək və

tutarlı arqumentlərdən istifadə etməklə mühüm nəticələr çıxarmağa imkan verir.

Qafqaz xalqları və ondan kənarda genetik bağlar və mədəni əlaqələr səviyyəsində əhatəli şəkildə təhlil göstərir ki, alan irsinin tədqiqi alan elementlərinin müasir maddi-mədəniyyətdə əksini aşkara çıxarmağa imkan verir.

Bu tədqiqatlarda sarmatlarla alanların bir kökə bağlılığı, mənşəcə müxtəlif xalqlar və tayfalarla bağlı spesifik xüsusiyyətlərə malik olması müəyyənləşmiş, alanların mənşəyinə dair fikirlər şərh edilmişdir. Bu zaman indiki çoxtərkibli Qafqaz xalqlarının - osetinlərin, çeçen-inquşların, qaraçaylıların, balkarların və b. kökündə az ya çox dərəcədə alanların durduğu bildirilmişdir. Həmçinin, tamamilə fərqli şəkildə - alanların vahid tayfa deyil, tayfa ittifaqından ibarət olması barədə fikirlər irəli sürülmüş, bu barədə çoxlu sayda əsərlər yazılmış, müzakirələr aparılmışdır. Bütün bu məsələlərə dair yeni tədqiqatlar zamanın tələbinə və şəraitin dəyişməsinə uyğun olaraq daha yeni fikirlərin meydana çıxacağına səbəb olmuşdur ki, bu iş hələ də davam etdirilir. Bu, böyük problem olaraq maraq kəsb etdiyi üçün yeni-yeni tədqiqatların aparılmasına ehtiyac olduğu da özünü büruzə verir.

Tədqiqatlarda sarmatlarla alanların bir kökə bağlılığı, mənşəcə müxtəlif xalqlar və tayfalarla eyni spesifik xüsusiyyətlərə malik olması fikri bildirilmiş, alanların mənşəcə müxtəlif xarakterliliyinə dair - türk mənşəli; Qafqaz mənşəli; fars mənşəli olması kimi fikirlər ifadə edilmişdir.

Qədim sarmat-alan tayfalarının mənşəyi ilk növbədə yazılı mənbə məlumatları əsasında onların ictimai quruluşu, yayılma arealı, məişəti, adət-ənənələri, dini inancları və s. aspektdə mühüm dövrlərinin tarixi, həmçinin, qonşu dövlətlər və xalqlarla münasibətləri, qarşılıqlı əlaqələri öyrənilmişdir.

Tarixi-arxeoloji tədqiqatlarla Albaniya (Azərbaycan) dövlətinin, Şimali Qafqazda məskunlaşmış sarmat-alanlarla qarşılıqlı əlaqələri, münasibətləri olması dəqiqləşdirilmişdir.

Alan mədəniyyətinin təsirinin daha az nəzərə çarpması Qafqazın etnik mühitinin türk etnik mühitlə çoxəsrlik və güclü qarşılıqlı təsiri ilə izah edilir. Məlum olur ki, bu təsirin nəticəsində mədəni spesifikanın tarazlaşması baş vermiş, ümumi elementlər yaranmış, alan maddi mədəniyyətinin Qafqaz, türk siması əmələ gəlmişdir.

Albaniya ilə alanlar arasında hərbi münaqişələrlə bərabər siyasi, iqtisadi, mədəni münasibətlər mövcud olmuşdur. Alanlar slavyanlarla və Şimali Qafqazın digər tayfaları ilə gah müttəfiq kimi çıxış etmiş, gah da münaqişəli şəkildə yaşamışlar.

Alan etnomədəni irsinin Qafqazda və onun hüdudlarından kənarda başlıca rolu olmuş, Qafqaz tarixi və mədəniyyətinə alanlar böyuk xəzinə vermişlər. Antik və ilk orta əsrlərdə özünəməxsusluğu ilə seçilən Qafqaz, xüsusilə Cənubi Qafqaz əhalisinin maddi mədəniyyətində sarmat-alan ənənələri mühüm yer tutmuşdur. Eyni zamanda Qafqaza eranın əvvəllərində gəlmiş alanlar Qafqazın digər xalqlarının mədəni irsindən, ənənələrindən bəhrələnmişlər.

Tarixi-arxeoloji tədqiqatlar nəticəsində məlum olmuşdur ki, alanlar Qafqazda, o cümlədən Cənubi Qafqazda mühüm maddi və mənəvi izlər qoymuşlar ki, bu da Qafqazın digər xalqları ilə onlar arasında etno-mədəni təsirin mövcud olmasını, qaynayıb-qarışmasını təsdiq etməyə imkan verir.

Məlumdur ki, qədim dövrdən müxtəlif istiqamətli əlaqələr xalqların qarşılıqlı zənginləşməsində, həyatın bütün sahələrində mühüm rol oynamışdır. İlk növbədə bu əlaqələr xalqların iqtisadi, sosial, mədəni və hətta siyasi həyatında mühüm pol oynamışdır.

Mühüm məsəllərdən biri də qonşu dövlətlər və xalqlarla münasibətlərin, Qafqaz regionunda yaşayan xalqlar arasındakı əlaqələrin qədimliyini və zənginliyini göstərməklə bərabər qədim ənənələrə malik hər bir xalqın maddi və mənəvi irsinin özünəməxsusluğunun qorunub saxlanmasıdır. Belə olduğu zaman hər bir xalq öz tarixi

mədəni irsi, ənənələri ilə tanınar, digərlərinin tarixi irsinə göz dikməz, onu mənimsəməyə çalışmaz. Bununla da Qafqaza XIX əsrdən etibarən miqrasiya etmiş ermənilərin Qafqaz xalqlarının hər hansı birinin mədəniyyətinə əsassız ərazi iddialarına son qoyula bilər.

## ƏDƏBİYYAT SİYAHISI
## *(References)*

1. Абаев В.И. ОЯФ. I. - Москва-Ленинград: 1949.
2. Абаев В.И. ИЭСОЯ. Т. I. 1989, с.236
3. Абрамова М.П. Подкумский могильник. – Москва: 1987. - s. 29-78
4. Алиев В.Н Катакомба в Бабадервише. //ИАН Аз ССР, серия истории, философии, права. - 1969, №4.
5. Аланика. Сведения греко-латинских, византийских, древнерусских и восточных источников об аланах-ясах (Сост. и комм. Ю.С. Гаглойти) № 1. – Дарьял:1993. - с.179-181.
6. Алборов Б.А. Почему осетины называют балкарцев «асы». В кн.: О происхождении балкарцев и карачаевцев. - Нальчик, 1960. - с. 108-112
7. Алеман А. Аланы в древних и средневековых писменных источниках. - Москва: 2003.
8. Алиев И.Г. Сармато-аланы на пути в Иран. История Иранского государства и культуры. – Москва: 1971.
9. Алиев Играр, Асланов Гардашхан. Племена сармато-массагетов-аланского круга в Азербайджане, //Древний Восток, 2. – Ереван: 1976. -с. 218-237
10. Алиев И. Асланов Г. К вопросу о проникновении на территорию Азербайджана племен сармато-аланского круга в первые века нашего летоисчисления. //Мат-лы научн.конф.по аланской археол. и истории северной Осетии. – Орджоникидзе: 1975, s. 218-237.
11. Арзанцева И. А., Малашев В.Ю. Зилгинское городище и проблема аланского потогорода на Северном Кавказе // 60 лет кафедре археологии МГУ им. М.В.Ломоносова. – Москва: 1999
12. Арзанцева И.А. Албегова З.Х. Культовые камни Кяфарского городища (еще раз о религиозном дуализме алан) // Древности Северного Кавказа. - Москва:1999
13. Асланов Г.М. Матеральная култура Мингечаура I-VII вв. (На основе археологии катакомбных погребений), авт дисс.на соискание учоной степени к.и.н. - Баку: 1963.
14. Бабаев И.А. Города Кавказкой Албании (в IV в. до н. э-III в.н.э). – Баку: Элм, 1990.
15. Виноградов В.Б. Об интерпереции сарматских погребальных памятников Предкавказья III-I вв. до н.э., 1968, №1
16. Виноградов В.Б. Сарматы Северо-восточного Кавказа. // Тр. Чечено-Ингушского НИИ, т.8. – Грозный: 1963.
17. Габуев Т.А. Аланские курганы у с. Брут в Северной Осетии // Первая Международная научная конференция. «Осетиноведение: история и современност». – Владикавказ: 1991.
18. Габуев Т.А. Аланские погребения IV в. н.э. в Северной Осетии // СА. 1985. № 2
19. Габуев Т.А. История племен центральных районов Северного Кавказа в I-VII вв.н.э. Автореф. канд. дисс. – Москва: 1986.
20. Гаглойти Ю.С. Аланы и вопросы этногенеза Осетии. -Тбилиси, 1966.
21. Гаглойти Ю.С. Аланы и скифо-сарматские племена Северного Причерноморья. //ИЮОНИИ. – Tбилиси: 1962. - T.XI.
22. Гамрекели В.Н. Двалы и Двалетия в I-XV вв. н. э. - Тбилиси, 1961. – с. 151-160
23. Лазарашвили Г.Р. О времени переселения осетин в Грузию. - СЭ, 1966, 2, с. 77
24. Гумилев Л.И. Открытие Хазарии. – Москва: Наука, 1966
25. Гутнов Ф.Х. Ранние аланы. Проблемы этносоциальной истории. – Владикавказ: 2001
26. Инал-Ипа Ш.Д. К абхазо-осетинским этнокультурным связям. В кн.: Происхождение осетинского народа. – Орджоникидзе: 1967, с.223.
27. Исмизаде О.Ш. Кабала – столица древней Кавказской Албании. VИКА. – Баку: 1962. – 160-175 с.
28. История Дагестана. – Махачкала: 1967. – 320 с.
29. Каминский В.Н. Раннесредневековье катакомбы на Средней Кубани // Вопросы археологии и этнографии Северной Осетии. – Орджоникидзе: 1984
30. Касимова Р.М. О краниологических материалах из раскопок в Мигечауре. В кн.: Вопросы истории Кавказской Албании. – Баку: Элм, 1962. - с.46-47
31. Кляшторный С.Г. Гуннская держава на Востоке (III в. до н.э. - IV в.н.э.) // История деревнего мира т.3.
32. Kalankatuklu. M. Albaniya tarixi (tərcümə Z.M.Bünyadovundur). – Bakı: 1993. - 235 s, к.1, f.21
33. Кириченко Д.А. Сармато-аланы в Азербайджане по данным антропологии. Институт

Археологии и Этнографии НАНА. - Баку (Сармато-аланы в Азербайджане по данным антропологии.pdf (164.71K) Number of downloads: 46)
34. Ковалевская В.Б. Кавказ – скифы, сарматы, аланы. I тыс. до н.э.- I тыс. н.э. - Москва: 2005
35. Ковалевская В.Б. Кавказ и аланы. - Москва: 1984
36. Козырева Т.З. Осетинская антропонимия древнего и средневекового периода. Ономастика Кавказа. – Махачкала: 1976. - с.224-225,
37. Кудрявцев А.А. Древний Дербент. – Москва: Наука, 1982. - 173 с.
38. Кудрявцев А.А. Мусульманский город Дагестана (Сложение Дербента в домонгольский период). – Махачкала, 1994. – 320 с.
39. Кудрявцев А.А. Феодальный Дербент: Пути и закономерности развития города в VI — сер. XII в.- Москва: Наука, 1993. 320 с.
40. Кудрявцев А.А. Дербент в системе Прикаспийской торговли Великого шелкового пути // В кн: Обмен духовными ценностями на Великом шелковом пути. - Душанбе, 1990. – с.155-185.
41. Кузнецов В.А. Очерки истории алан. – Владикавказ: 1992
42. Кузнецов В.А. Алано-осетинские етюды. «Великий Шелковый пут» и Северный Кавказ. – Владикавказ: 1993.
43. Hacıyeva D.A. Qafqaz Albaniyasinin sarmat-alan tayfalari ilə qarşiliqli əlaqələri (tarixi-arxeoloji tədqiqat) (5505.02 – Arxeologiya) Tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunmuş dissertasiyanın avtoreferatı. – Bakı: 2013.
44. Xəlilov C.A. Xınıslı - qədim yaşayış yeri. Az.SSR EA Xəbərləri. - 1961, № 3. - с.108.
45. Меликишвили Г.А. К истории древней Грузии. – Тбилиси: 1959. - s.35.
46. Апакидзе А.М., Гобедшишвили Г.Ф., Каландадзе А.Н., Ломтатидзе Г.А. Мцхета. Итоги археологических исследований 1. – Тбилиси: 1958. - с. 355-356.
47. Мизиев И.М. История рядом. - Нальчик, 1990.
48. Мизиев И.М. Шаги к истокам этнической истории Центрального Кавказа. - Нальчик, Эльбрус», 1986
49. Минаева Т.М. К истории алан Верхного Прикубаня по археологическим данным. - Ставропол, 1971
50. Седов В.В. Скифо-сарматские элементы в погребальном обряде черняховской культуры. — В: Вопросы древней и средневековой археологии Восточной Европы. - Москва: 1978. - s.99-107.
51. Мошкова М.Г. К вопросу о катакомбных сооружениях как специфическом этническом определителе. //История и культура сарматов. - Саратов: 1983
52. Нечаева Л.Г. Осетинские погребальные склепы и этногенез осетин. В кн.: Этническая история народов Азии. – Москва: Наука, 1972. - с. 267-292.
53. Ниорадзе Г. Раскопки в Алазанской долине. – Тбилиси, 1940, с.105
54. Перевалов С. М. Военное дело у аланов II в. н. э. (по трактатам Флавия Арриана «Диспозиция против аланов» и «Тактика». // Историко-археологический альманах. - Вып. 2, 1997.
55. Реслер Э.А. Отчет о поездке в дер. Беюк-Дегне Нухинского уезда Елизатветопольской губернии и раскопки, произведенные там. - ДАК, 1902. - s.66
56. Похомов Е.А. Обследование и раскопки кувшинных погребений Азербайджана. //Изв. АзФАН СССР. - 1939, №3
57. Алекперов А.К. Исследования по археологии и этнографии Азербайджана. – Баку: Элм. – 1960.- 140 с.
58. Смирнов К.Ф. О некоторых итогах исследования могильников меотской и сарматской культуры Прикубанья и Дагестана. - КСИИМК, XXXVI, 1951, 151-160;
59. Смирнов К.Ф. Вооружение савроматов. МИА, № 101. - Москва: 1961. - с.77
60. Смирнов К.Ф. Савроматы. Ранняя история сарматов. - Москва: 1964
61. Смирнов К.Ф. Савроматская и раннесарматская культура //Археология СССР. Степи европейской части СССР в скифо-сарматское время. - Москва:1989. с.169-170
62. Смирнов К.Ф. Грунтовые могильники албано-сарматского времени у сель Карабудахкент. - МАД, 1991, т.2.
63. Страбон. География в 17 книгах. Перевод Г.А.Стратоновского. - Ленинград: Наука, 1964. - 940 с. X1, 2. 3.
64. Тревер К. В. Очерки по истории и културе Кавказской Албании (IV в до н.э-VII в.н.э). Москва. –Ленинград: Изд. АН СССР, 1959. - 390 с.
65. Халилов Дж. А. Материальная культура Кавказской Албании (IV в. до н.э.- III в. н.э.). - Баку: Элм, 1985. - s.44.
66. Xəlilov C.A. Xınıslı - qədim yaşayış yeri. Az.SSR EA Xəbərləri. - 1961, № 3.
67. Халилов Дж., Бабаев И.А. Античные традиции в материальной культуре Кавказской Албании. //Сб. Античность и античные традиции в культуре и искусстве народов Советского Востока. – Москва: 1978
68. Цулая Г.В. К истории имени «Абрскил». СЭ, 1966. - 6, s.89.
69. Юсифов Ю.Б. Киммеры, скифы и саки в древнем Азербайджане // Кавказско-Ближневосточный сборник, т. 8. – Тбилиси: 1988, - с. 181-188.